UOT: 331.5

# ÖZÜNÜMƏŞĞULLUQ PROQRAMININ KƏND ƏHALİSİNİN MƏŞĞULUĞUNUN ARTIRILMASINDA ROLU

**S.R. MUSTAFAYEV**
**AKTN-nin Aqrar Tədqiqatlar Mərkəzi**

*Məqalədə ölkəmizdə reallaşan sosial layihənin- mütərəqqi və aktiv məşğulluq tədbirlərini özündə əks etdirən proqramın- özünüməşğulluq proqramının qeyri-neft sektoru xüsusilə kənd təsərrüfatı istiqamətində region əhalisinin məşğulluğunun effektiv artırılmasının əsas istiqamətləri müəyyənləşdirilmişdir.*

***Açar sözlər:*** *özünüməşğulluq, sosial sahə, kənd əhalisi, kənd təsərrüfatı, qeyri-neft sektoru.*

Bildiyimiz kimi, Respublikamız 1991- ci ildə müstəqilliyini bərpa etdikdən sonra bazar iqtisadiyyatının sosialyönümlü istiqaməti əsas iqtisadi sistem olaraq qəbul etmiş və bu istiqamətin prinsiplərinə uyğun olaraq proqramlar qəbul edilir.Ölkəmizdə əsas prioritet istiqamət kimi neft strategiyasının qurulmasından sonra qeyri-neft sektorunun müxtəlif sahələrinin inkişafı üçün mühüm qanunlar qərarlar qəbul edilərək uğurla icra edilmişdir.

Dünya ölkələrinin iqtisadiyyatlarının qloballaşdığını nəzərə alsaq dünyada baş verən maliyyə və iqtisadi xarakterli digər problemlər ölkəmizdən də yan keçməmişdir.Belə böhran vəziyyətlərdə belə (neftin qiymətinin kəskin azalması dünya maliyyə və əmtəə birjalarında baş verən digər problemlər,inflyasiya və devalvasiya kimi iqtisadi hadisələr) ölkəmizdə əsas sosial- iqtisadi proqramlardan imtina edilmir və büdcə müzakirələri zamanı sosial proqramların icrası prioritet təşkil edir.

Müstəqilliyimizin bərpasından bu günədək ölkəmizdə xüsusilə regionlarda Uğurla həyata keçirilən sosial-iqtisadi layihələr əsasən sosial müdafiəyə xüsusi ehtiyacı olan əhali təbəqəsinin, işsiz və işaxtaran vətəndaşların passiv və aktiv sosial müdafiəsinin təşkilində özünü uğurla doğruldur.Lakin son zamanlar passiv tədbirlərdən daha çox layihələrin aktiv məşğulluq tədbirlər çərçivəsində həyata keçirilməsi, əhalinin xüsusilə regionlarda yaşayan kənd əhalisinin məşğulluğunun artırılmasına onların aktiv həyat tərzi keçirmələrinə geniş şərait yaratmışdır.

**2. Ölkəmizdə iqtisadi fəal əhalinin təhlili və kənd yerlərində məşğulluq vəziyyəti**

Məlumdur ki, insan resursları istehsal resurslarının vacib faktorlarından biridir.İnsan faktoru olmadan heç biri iqtisadi fəaliyyətdən söhbət gedə bilməz. XIX əsrin sonları və XX əsrin əvvəllərində sənayedə baş verən inqilablar, texniki tərəqqinin nailiyyətləri ilə bir çox sənaye sahələrində bəzi işləri artıq əl əməyi deyil, texnikalar dəzgahlar yerinə yetirirdi və iş yerlərinin ixtisarı baş verirdi.Lakin bütün bunlarla yanaşı bu texnika idarə etmək üçün də ixtisaslı kadrlara ehtiyac günü -gündən artırdı.Eyni vəziyyət kənd təsərrüfatı sahəsində də baş verirdi.Yeni texnikaların ixtirası və inkişafı sahəsində əl əməyindən istifadə azalsa da məhsuldarılıq artırdı, bu da sahibkarlarda kənd təsərrüfatına maliyyə vəsaiti yatırmağa həvəsləndirirdi.Digər tərəfdən artıq rəqəmsal iqtisadiyyatın təşəkkül tapdığı XXİ əsrdə aqrar sahə bu gün dünyada əhalinin sayınının və yaşayış vasitələrinə xüsusilə ərzaqa olan tələbatın sürətlə artdığı zamanda prioritetdir.

Cədvəl-1 də ölkəmizdə əhalinin sayı, şəhər və kənd əhalisinin sayı verilmişdir.

**Cədvəl 1.**

| Azərbaycan Respublikasında əhalinin sayı | | | | | |
|---|---|---|---|---|---|
| İllər | Əhali (min nəfər) | Şəhər əhalisi (min nəfər) | Kənd əhalisi (min nəfər) | Şəhər əhalisi % | Kənd əhalisi % |
| **2014** | 9477,1 | 5045,4 | 4431,7 | 53 | 47 |
| **2015** | 9593,0 | 5098,3 | 4494,7 | 53 | 47 |
| **2016** | 9705,6 | 5152,4 | 4553,2 | 53 | 47 |
| **2017** | 9810,0 | 5199,0 | 4611,0 | 53 | 47 |
| **2018** | 9898,1 | 5237,8 | 4660,3 | 53 | 47 |

Mənbə: Statistika Komitəsi

Cədvəldən müəyyən etdiyimiz kimi əhali sayında 5 il ərzində 421 min nəfər artım olmuşdur ki, bu da orta hesabla il ərzində 84,2 min nəfər təşkil edir. Analoji məlumat kənd yerlərində yaşayan insanlara da aiddir və burada da biz, 228,6 min nəfər başqa sözlə il ərzində 45,72 min nəfər artım müşahidə edirik.

Bu gün dünyada urbanizasiya prosesinin sürətlə getdiyi bir vaxtda şəhər əhalisinin kənd əhalisinə nisbətdə sürətlə artdığı müşahidə olunur. Ölkəmizdə də 1990 cı- 2000 ci illər ərzində əmək qabiliyyətli əhalinin şəhər və şəhər ətrafı qəsəbələrə iş axtarmaq məqsədilə axını real bir proses idi. Lakin ard-arda uğurla həyata keçirilmiş Regionların Sosial İqtisadi inkişafı dövlət proqramlarının uğurlu nəticələri tam

şəffaflıqla özünü regionların inkişafında və kənd əhalsinin sayının artımında açıq şəkildə biruzə vermişdir.

Ölkəmizin rayonlarında sosial-iqtisadi şərait yaxşılaşdırılmış, bu özünü regionlarda yaşayış,səhiyyə, idman, mədəniyyət və elm ocaqlarının təmiri və ya yeni binaların tikilməsi ilə, kənd əhalisinin kommunal xidmətlərdən istifadəyə əlçatanlığı ilə, yolların, körpülərin tikintisi, regionlarda sənaye parklarının, aqroparkların salınması və xüsusilə kənd rayonlarında kənd təsərrüfatı və qeyri kənd təsərrüfatı üzrə iş yerlərinin yaranmasında dövlətin birbaşa qayğısı və dəstəyi şəklində şəffaf şəkildə biruzə verir. Kənd yerlərində təhsil müəssisələrinə çalışmaq üçün imtahandan keçmiş savadlı kadrların məvaciblərinə əlavələrin edilməsi və sosial –iqtisadi şəraitlərinin yaxşılaşdırılması məqsədi ilə atılmış addımlar bu prossesin sadəcə bir elementidir.

Kənd əhalisinin məşğulluğunun təminində başlıca sahə kənd təsərrüfatıdır. Bu sahədə dövlət tənzimlənməsinin uğurlu nəticələri olaraq son zamanlar sürətli inkişaf prosesi gedir. Kənd təsərrüfatı sahəsində əsas faktor kimi torpaq amili götürülür. İstər bitkiçilikdə istərsə də heyvandarlıqda torpaq vacib amildir.

Cədvəl 2 də 2014-2017 ci illəri əhatə edən dövr üçün Azərbaycanda əhali və ərazinin mövcud statistik məlumatları öz əksini tapmışdır.

Cədvəldən müəyyən edilir ki,4 il ərzində əhali sayında 3,18 faiz artım baş vermişdir. Bununla yanaşı görülmüş tədbirlər nəticəsində 2014-2017-ci illər ərzində kənd təsərrüfatına yararlı sahələr 7,8 min ha artmışdır. Bundan başqa 4 il ərzində əkin yerlərində də 8,9 faiz artım olmuşdur.

**Cədvəl 2**

**Azərbaycanda əhali və ərazi 2014-2017 ci illər.**

| Əhali və ərazi | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| **İllər** | **Əhali** | **Ərazi $1000^2$ km** | **Kənd təsərrüfatına yararlı sahə 1000ha** | **$1^2$km Düşən adam sayı** | **100 ha k/T yararl Torpağa düşən adam sayı** | **Adambaşına k/t yararlı torpaq düşür ha** | **əkin yeri 1000 ha** |
| **2014** | 9593,0 | 86,6 | 4769,7 | 111 | 201 | 0,50 | 1885,6 |
| **2015** | 9705,6 | 86,6 | 4769,8 | 112 | 203 | 0,49 | 1897,5 |
| **2016** | 9810,0 | 86,6 | 4772,9 | 113 | 206 | 0,49 | 1959,1 |
| **2017** | 9898,1 | 86,6 | 4777,5 | 114 | 207 | 0,48 | 2054,7 |

*** Əmlak Məsələləri Dövlət Komitəsinin məlumatları**

Bütün bu göstəricilər kənd təsərrüfatında məşğulluğun artımına birbaşa təsir amilləridir və hesab edirik ki, kənd təsərrüfatına dövlət dəstəyi, yeni aqroparkların yaradılması, ailə-fermer təsərrüfatlarının lazımi istehsal vasitələri ilə təminolunma vəziyyətinin yaxşılaşdırılması, gənclərin kənd yerlərində qalıb əmək fəaliyyəti ilə məşğul olmalarına stimul verəcəkdir.

Məlumdur ki, hər bir ölkədə əmək vərdişləri ,ixtisaslaşma həmin ölkənin iqtisadi inkişafına vacib faktorlardandır.İqtisadiyyatın müxtəlif sahələrində əmək resurslarının iqtisadi rayonlar üzrə dinamikasının öyrənilməsi, kənd yerlərində məşğulluğun indikatorlarındandır.

Cədvəl- 3 də iqtisadiyyatın kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılıq sahəsində 2014-2017 ci illər üzrə statistik göstəriciləri, iqtisadi rayonlar üzrə məşğul əhalinin say dinamikası öz əksini tapmışdır.

Cədvəl 3- in məlumatları onu deməyə əsas verir ki, Ölkəmizdə bütün iqtisadi rayonlar üzrə məşğul əhalinin sayında ilbəil artım müşahidə olunur. Bundan başqa kənd təsərrüfatı meşə təsərrüfatı və balıqçılıq sahəsində çalışan insanların sayında 4 il ərzində 61,2 min nəfər artım baş vermişdir.

Son zamanlar qloballaşan dünya iqtisadi reallığında iqtisadiyyatda mövcud resurslardan səmərəli istifadənin təşkilinin təkmilləşdirilməsi məsələsi xüsusilə aktualdır. Bu istiqamətdə mühüm araşdırmalar aparılır, yeniliklər tətbiq edilir. Belə mühüm resurslardan biri də əmək resursları - insan amilidir. Xüsusilə kənd rayonlarının inkişafı bilavasitə əmək resurslarından daha səmərəli istifadənin təşkili ilə bağlıdır.

**Cədvəl 3.**

**İqtisadi rayonlar üzrə məşğul əhalinin sayı**

| **İllər** | **2014** | **2015** | **2016** | **2017** |
|---|---|---|---|---|
| **Kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılıq sahəsində çalışanların sayı.(min nəfər)** | **1691,7** | **1698,4** | **1729,6** | **1752,9** |
| **Ümumu iqtisadi sahələrə nisbətdə %-lə** | **36,7%** | **36,4%** | **36,3%** | **36,4%** |
| **İqtisadi rayonlar üzrə məşğul əhalinin sayı**(min nəfər) Abşeron iqtisadi rayonu | **269.3** | **272,4** | **277,4** | **279,7** |
| Gəncə Qazax iqtisadi rayonu | **608,9** | **619,1** | **630,9** | **644,3** |
| Şəki Zaqatala iqtisadi rayonu | **295,5** | **301,0** | **306,8** | **310,7** |
| Lənkəran iqtisadi rayonu | **409,5** | **416,0** | **423,9** | **429,5** |
| Quba-Xaçmaz iqtisadi rayonu | **243,2** | **247,8** | **252,5** | **255,5** |
| Aran iqtisadi rayonu | **904,1** | **919,2** | **936,7** | **948,9** |
| Naxçıvan Muxtar Respublikası | **228,6** | **231,0** | **233,5** | **235,5** |
| Kəlbəcər –Laçın iqtisadi rayonu | **116,1** | **118,2** | **120,4** | **121,8** |
| Yuxarı Qarabağ iqtisadi rayonu | **279,2** | **283,4** | **288,7** | **292,3** |

| Dağlıq Şirvan iqtisadi rayonu | 142,5 | 145,9 | 148,6 | 150,3 |
|---|---|---|---|---|

**Mənbə: Statistika komitəsinin elektron məlumatları əsasında müəllif tərəfindən hazırlanıb**

Uğurla həyata keçirilən sosial-iqtisadi layihələr əsasən sosial müdafiəyə xüsusi ehtiyacı olan əhali təbəqəsinin, işsiz və işaxtaran vətəndaşların passiv və aktiv sosial müdafiəsinin təşkilində özünü uğurla doğruldur.Lakin son zamanlar passiv tədbirlərdən daha çox layihələrin aktiv məşğulluq tədbirlər çərçivəsində həyata keçirilməsi, əhalinin xüsusilə regionlarda yaşayan kənd əhalisinin məşğulluğunun artırılmasına onların aktiv həyat tərzi keçirmələrinə geniş şərait yaratmışdır.

**3. Özünüməşğulluq Proqramının kənd əhalisinin məşğulluğunun artırılması təsiri imkanları.**

Aztəminatlı ailələrin sosial rifahını yüksəltmək məqsədilə sosial siyasət sahəsində mühüm tədbirlərdən biri də Azərbaycan Respublikası Prezidentinin 7 aprel 2016-cı il tarixli 1941 nömrəli "Əhalinin özünüməşğulluğunun təmin olunması sahəsində əlavə tədbirlər haqqında" Sərəncamına əsasən həyata keçirilən **özünüməşğulluq proqramı**dır. Bu proqram çərçivəsində aztəminatlı ailələrə fərdi təsərrüfatlarının təməlini qoymaq və ya inkişaf etdirmək üçün dövlət vəsaiti hesabına ailəyə birbaşa natura şəklində mal, material və digər əmlakın verilməsi ilə (nağd vəsait olmamaq şərti ilə) dəstək göstərilir. Ailə təqdim etdiyi biznes plana uyğun olaraq istehsal və ya xidmət avadanlıqları ilə təmin edilir. Bu dövlət özünüməşğulluq proqramını digər ölkələrdəki təcrübədən fərqləndirən cəhətdir.

Azərbaycan Respublikasının qanunvericiliyində özünüməşğulluq - əmək qabiliyyətli şəxslərin müstəqil surətdə özünü işlə təmin etməsi kimi təsbit edilib (1).

Özünüməşğulluq proqramında iştirak bir neçə mərhələdən ibarətdir. İlk növbədə, iştirak etmək üçün Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi yanında Dövlət Məşğulluq Xidmətinin yerli orqanlarında (şəhər, rayon məşğulluq mərkəzlərində) qeydiyyata dayanmaq lazımdır.Nazirlik tərəfindən məşğulluq orqanlarında işsiz və işaxtaran kimi qeydiyyata alınmış və özünüməşğulluq fəaliyyətini qurmaq üçün potensial imkanlara malik şəxslər müəyyən olunur və biznesin təşkili ilə bağlı bir aylıq təlim kurslarına cəlb edilirlər.Beynəlxalq Əmək Təşkilatının baş təlimçisinin iştirakı ilə hazırlanmış təlimçilər tərəfindən keçirilən təlim kurslarında iştirakçılar biznes fəaliyyətinin təşkili ilə əlaqədar zəruri bilik və bacarıqlara yiyələnirlər. Kursları başa vuran və qiymətləndirmə zamanı biznes-planları uğurlu hesab edilən işsiz və işaxtaran şəxslərin seçdikləri iqtisadi fəaliyyət növləri üzrə özünüməşğulluq fəaliyyətinin təşkili üçün onlar aktivlərlə təmin olunurlar. Bu aktivlər natura şəklində material, avadanlıq və digər əmlakın 2 (iki) il müddətinə müqavilə əsasında verilir. Aktivlər verildikdən sonra da proqram iştirakçılarına biznesin idarə edilməsi və inkişafı ilə bağlı müvafiq məsləhətlərin verilməsi təmin edilir və özünüməşğulluq fəaliyyətinin 2 il ərzində monitorinqi aparılır. Müqavilə müddətinin sonuna həmin şəxsin fəaliyyəti təqdim edilmiş biznes-plana uyğun olduqda, verilmiş əmlak özünüməşğulluğa cəlb olunmuş şəxsin mülkiyyətinə verilir. (2)

Şəkil1-də Ozünüməşğulluq proqramının ilk mərhələsində maliyyələşdirilməsi nəzərdə tutulan sahələrin sxemi verilmişdir.




**Mənbə: Azərbaycan Respublikası Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi, "İllik Hesabat 2016"**

Şəkildən də göründüyü kimi proqram maliyyələşmənin 83,6 faizi kənd təsərrüfatı sahələrini əhatə edir. Bu da ard –arda hazırlanaraq təsdiq edilmiş və icra edilmiş uğurlu layihələrin davamı kimi təsnifləşdirilir.

İlk olaraq Cəbrayıl rayonu üzrə 123 nəfər (Biləsuvar rayonu, 5 saylı qəsəbə), Füzuli rayonu üzrə 108 nəfərə, ümumilikdə 231 şəxsin əsasən heyvandarlıq üzrə kiçik ailə təsərrüfatlarını qurmaları üçün mal və materiallarla təmin olunması nəzərdə tutulub. Ötən il özünüməşğulluq proqramına 1200 nəfər cəlb olunub. Bu il rəqəm dəfələrlə artaraq 7 minədək işsiz və işaxtaran vətəndaşın proqrama cəlb olunması nəzərdə tutulub. Artıq özünüməşğulluq fəaliyyətini qurmaq üçün potensialları olan 7300-dən çox vətəndaş seçilərək proqram üzrə təlimlərə cəlb olunub. Onlardan təlim kursunu bitirən və qiymətləndirmələr zamanı biznes planları uğurlu hesab edilənlərin hər biri mal və materiallarla təmin olunacaq, kiçik ailə bizneslərinin yaradılması üçün köməklik ediləcək. Bu istiqamətdə ilk işlərə Cəbrayıl və Füzuli rayonları üzrə başlanılması məcburi köçkünlərin, habelə cəbhəyanı ərazilərdə yaşayanların sosial müdafiəsinin daim diqqət mərkəzində saxlandığını bir daha göstərir. Hər iki rayon üzrə proqram iştirakçıları məcburi köçkünlər olmaqla yanaşı, onların sırasında 50 nəfər əlilliyi olan şəxs, 8 şəhid ailəsi üzvü, 76 nəfər sağlamlıq imkanları

məhdud uşağı olan valideyn və başqaları var. Eyni zamanda, 231 nəfər iştirakçıdan 63 nəfəri qadın,71 nəfəri gəncdir. Verilmiş mal və materialların hesabına reallaşdırılan biznes planların böyük əksəriyyəti kənd təsərrüfatı sahələrini əhatə edir. (3)

Özünüməşğulluq tədbirləri cəlb edilmiş kənd əhalisinin məşğulluğunu təmin etməklə bərabər kənd yerlərində mikro və kiçik sahibkarlığın təşviq edilməsi və əsasən gənclərin şəhərlərə daxili miqrasiyasının qarşısının alınması, onların özünüməşğulluqlarının təmin edilməsi və potensial imkanlarından faydalı istifadə edilməsi kimi vacib amilləri özündə ehtiva edir. Xüsusilə kənd təsərrüfatına dövlət dəstəyinin vergi güzəştləri və lazım olan gübrələrin, texnikanın alınmasında geniş əhatəsini nəzərə aldıqda özünüməşğulluq tədbirlərinin kənd əhalisinin tamamlilə ödənişsiz olaraq lazımi iribuynuzlu və xırdabuynuzlu heyvanlarla təmin edilməsi ilə üst-üstə düşməsi bu tədbirin artıq bəhrəsini vermiş uğurlu bir lahiyə olduğundan xəbər verir.

Müasir dövrün tələblərinə cavab verən özünüməşğulluq tədbirləri qeyri məşğul əhalinin xüsusilə regionlarda və kənd yerlərində yaşayan insanların məşğuliyyətinin təminində mühüm rol oynamaqla bərabər əsasən aktiv sosial tədbirdir. Belə ki bu tədbir artıq kənd əhalisinin qanunvericiliyin tələblərinə uyğun şəkildə onlara təqdim edilmiş mal və materiallarla xüsusilə kənd təsərrüfatında heyvandarlığın inkişafı istiqamətində öz şəxsi təsərrüfatlarını yaratmaları, inkişaf etdirmələri, kənd yerlərində mikro və kiçik sahibkarlıq subyektlərinin arıtılması istiqamətində atılmış mütərəqqi uğurlu addımdır. Özünüməşğulluq proqramı mütərəqqi aktiv sosial müdafiə tədbirlərindəndir. Bütün qeyd edilənləri nəzərə alaraq Özünüməşğulluq proqramının əsas üstün tərəflərini aşağıdakı kimi təsnifləşdirmək məqsədə uyğundur :

1. Ailə kəndli təsərrüfatlarında fərdi təsərrüfatın inkişafına birbaşa istehsal vasitələri ilə dövlət dəstəyi onlarda gələcəyə ümidi artırır və daxili miqrasiya, urbanizasiya probleminin qarşısı müəyyən qədər alınır;

2. Kənd yerlərində mikro və kiçik sahibkarlığın dayanıqlı inkişafını təmin edir;

4. Sosial layihələrə ayrılmış vəsaitin (dövlət vəsaitləri) xərclənməsində səmərəliliyin artırılmasını təmin edir.

5. Regionlarda yoxsulluq səviyyəsinin azaldılması, məşğulluğun təmini və əhali gəlirlərinin arıtırlmasında müstəsna rolu vardır.

6. Regionlarda qeyri-neft sektoru üzrə xüsusilə kənd təsərrüfatı və turizmin inkişafı, əmək resurslarından istifadənin səmərəliliyinin artırılması istiqamətində dəstək mexanizmidir.

7. Bölgələrdə kənd əhalisinin qeyri-kənd təsərrüfatı (ticarət, xidmət) istiqamətində məşğulluq səviyyəsinin yüksəldilməsinə köməklik göstərəcəkdir.

**ƏDƏBİYYAT**

1. Məşğulluq haqqında Azərbaycan Respublikasının Qanunu, Maddə: 1.0.6. 2. http://sosial.gov.az/umumimelumatozunumewgulluq.3.https://azertag.az/xeber/Ozunumesgulluq_proqrami_cherchivesinde_ issiz_vetendaslara_mal_ve_materiallarin_verilmesine_baslanilib-1203290.

**The role of the self-employment program in raising the rural population's employment**

**S.R.Mustafayev**

The article analyzes the main directions of the effective promotion of the employment of the population in the non-oil sector, particularly in the field of agriculture, of the self-employment program of the social project - progressive and active employment measures in our country

***Key words:*** *self-employment, social sphere, rural population, agriculture, non-oil sector.*

**Роль программы самозанятости социального сферы сельского насиление**

**С.Р.Мустафаеа**

В статье анализируются основные направления эффективного содействия занятости населения в ненефтяном секторе, в частности в области сельского хозяйства, программы самозанятости социального проекта - прогрессивные и активные меры занятости в нашей стране.

***Ключевые слова:*** *самозанятость, социальная сфера, сельское население, сельское хозяйство, ненефтяной сектор.*